*Cədvəl 2.*

**Müxtəlif genotipli erkək cəmdəyinin morfoloji quruluşu**

| Göstəricilər | Qafqaz qonuru | Simmental | | ½ Kuba zebu x ½ Simmental |
|---|---|---|---|---|
| | | | Faktiki | Simmentala nisbətən %-lə |
| Soyudulmuş kütləsi, kq | 168,1 | 208,4 | 254,3 | 122,0 |
| Yumşaq | 129,5 | 161,9 | 200,4 | 123,8 |
| Sümük | 32,5 | 40,1 | 45,3 | 112,9 |
| Qığırdaq və vətərlər | 5,3 | 4,8 | 7,2 | 150 |
| Obvalkada itkilər | 0,7 | 0,8 | 1,1 | 137,5 |

Əgər biz yumşaq ətin çəkisinə nəzər yetirsək məlum olar ki, yumşaq ət Qafqaz qonurunda 125,5 kq olduğu halda, hibridlərdə isə bu göstərici 167,2 kq-a çatmışdır. Simmental cinsinin hibridi ilə müqayisə etdikdə məlum olar ki, yumşaq ət Simmental cinsində 161,9 kq olduğu halda, hibridlərdə isə bu göstərici 200 kq-dan yuxarı olmuşdur (Abdullayev, Sadıqova, 2009: 23).

Biz, hər dörd qrupda Simmental hibridin daha çox yumşaq ətə malik olduğunu görürük. Cəmdəyin morfoloji quruluşunun təhlilində sümük göstəricisi Qafqaz qonurunda 32,5 kq olduğu halda, onun hibridində 38,8 kq olduğu aydınlaşır, yəni burada orta hesabla hibridlərdə 6 kq-dan çox sümük olduğu məlum olur. Simmental cinsində bu göstərici 40,1 kq olduğu halda, hibridlərdə 45,3 kq olmuşdur.

Qığırdaq və vətərlərin təhlilindən aydın olur ki, cəmdəyin çoxluğuna görə Qafqaz qonurunun və Simmental cinslərə nisbətən hər 2 qrup hibridlərdə bu göstəricilər üstünlük təşkil edir. Sümüyün ayrılması dövründə bütün qruplarda cəmi 1%-ə qədər itki əldə olunmuşdur (6).

Cədvəlin ümumi təhlilindən aydın olur ki, morfoloji quruluşlu hibridlərdə xüsusi yumşaq ət, soyudulmuş cəmdəyə nisbətən ətlik qaramalın tələblərinə uyğun formada özünü əks etdirmişdir. Yəni yeyilən ət, sümüyə nisbətən qığırdağa nisbi və ümumi ətə nisbətən üstünlük təşkil etmişdir.

Əgər ətdə quru maddəsinə görə yüksək zülal bolluğu varsa, ət yüksək keyfiyyətli hesab olunur. Belə ətin bioloji cəhətdən dəyərliliyi onun tərkibindəki əvəzolunmaz amin turşularının miqdarı ilə müəyyən olunur (Davati, Orang, Abbasov, 2008: 77-80).

Əzələ toxumasının əsas zülalı miozindir. Miozin əzələ toxumasının zülal tərkibinin 35-40%-ni təşkil edir. Ətdən çıxardılmış zülal miozin suda həll olmur, duzlu məhsulda isə ətin üst qatında da artırılmış nazik pərdə əmələ gəlir. Miozin zülal daxilində aktin ilə qarşılıqlı təsirdə olur və aktomiozin kompleksi əmələ gətirir.

Ümumi əzələ zülalının 12-15%-ni aktin təşkil edir. Bu, iki formada özünü biruzə verir, fibrinli və qlobulinli. Əzələdə aktinfibrin formasında olur. Qarışıq məhsul aktin və miozin (1:3) aktomiozin zülalı yaradır. Əzələ toxumasında qlobulin-miogen, mioqlobin zülalına da təsadüf edilir (Draganov, Shurkin, 2006: 11-13).

Mioqlobin-əzələ toxumasında tənəffüs piqmentidir və əzələni rəngə boyayır. Əzələ toxumasında mürəkkəb zülallardan ribonuklein və dezoksiribonuklein turşuları, elastik, kollogen və mukoprotein olur. Buraya, həmçinin azotlu və azotsuz ekstraktiv maddələr də daxildir. Azotlu ekstraktiv maddələrə ATF, ADF, adenin turşusu, kreatin, karnozin və başqaları daxildir. Əzələ toxumasının son məhsulu ekstraktiv maddələrə daxildir. Əzələdə sərbəst yağ, fosfotidlər, qlikopidlər və steoridlər olur. Onların miqdarı heyvanların cinsindən, yemləmə səviyyəsindən, xüsusən köklük dərəcəsindən asılıdır. Belə ki, qaramalda yağ 3,0%-dən 35% arasında tərəddüd edir. Əzələdə mineral maddələr 1,0-1,5% olur ki, onların əsasını natrium, kalium, kalsium, maqnezium və digər duzlar təşkil edir (Kosilov, Salikhov, Bagirov, Yusupov, 1999: 25-29).

Cəmdəkdə yağ artdıqca mineral maddələr azalır. Ətdə birləşdirici toxumanın əsasını kollogen təşkil edir. Az bir hissəsində isə elastin yerləşir. Kollogen birləşdirici toxumanın əsasını təşkil edən zülaldır. O, soyuq suda həll olmur. Birləşdirici toxumada kollogen iki formada: promokollogen və protokollogen olur.

Elastin − kollogenin davamıdır. O, nə isti, nə də soyuq suda həll olunmur. Ətin əsası zülal göstəriciləri triptofan və oksiprolin nisbətləridir. Bu amin turşuların zənginliyi və heyvanın əzələ keyfiyyətinin əsasını əvəzolunan və əvəzolunmayan aminturşu nisbətləri həll edir (Kugenov, Stepanov, 1974: 26-32).

Əzələ toxumasının əsasını zülal təşkil edir. Ətin bioloji tam qiymətliliyi onun tərkibində olan aminturşuların: lizin, triptofan və kükürd tərkibli amin turşularıdır. Ona görə ki, orada triptofan yoxdur. Birləşdirici toxuma kollagendə 14%-ə qədər əvəzolunan oksiprolin amin turşusu vardır. Hansı ki həmin amin turşu ətdə zülalın tam qiymətliliyini təyin edir. Ətin bioloji keyfiyyətliliyi triptofan, oksiprolin nisbətləri ilə xarakterizə olunur. Təcrübə qrupu heyvanların zülal göstəricilərinin adları aşağıda qeyd edilmişdir (Sadıqova, 2010: 76-77).

Məlum olduğu kimi, ətin keyfiyyətli olması zülalın və zülalın tərkibinin zənginliyi ilə xarakterizə olunur. Ətdə mioqlobin göstəricilərinin xarakterizəsi zülal keyfiyyətinin göstəricisi ilə əlaqədardır (Sadıqova, 2010: 214-218). Ətin zülal göstəricisi ətin tərkibində olan amin turşularının zənginliyi ilə daha sıx bağlıdır (Cədvəl 3.).

***Cədvəl 3.***

**Təcrübə heyvanlarının ətinin zülal keyfiyyət göstəriciləri (x±m)**

| **Qruplar** | | **Triptofan, mq, %** | **Oksiprolin mq, %** | **Zülal keyfiyyət göstəriciləri** |
|---|---|---|---|---|
| Qafqaz qonuru | | 346,3±3,48 | 68,35±1,77 | 4,98±0,18 |
| Simmental | | 373,45±4,30 | 83,5±4,5 | 4,47±0,29 |
| ½ Kuba x ½ Simmental | Faktiki | 382,71±3,34 | 72,2,0±1,93 | 5,30±0,14 |
| | Simmental nisbətən %-lə | 101,0 | 91,09 | 111,65 |

Əgər burada triptofan oksiprolinə nisbətən azlıq təşkil edirsə, bu, ətdə zülal göstəricisinin aşağı olması deməkdir (Karayev, 1984). Məsələn, apardığımız tədqiqatlarda cədvəldən göründüyü kimi, Qafqaz qonuru Triptofan 346,3 mq, % təşkil edirsə, hibridlərdə bu göstərici 365,3 mq, %-dir və bunların oksiprolinə görə nisbəti isə Qafqaz qonurunda 4,98 mq, %, hibridlərdə isə 5,45 mq, % olmuşdur. Simmental cinsində bu göstərici 373,45 mq, % olduğu halda, hibridlərdə 382,7 mq, % olmuşdur ki, bu da zülal keyfiyyət göstəricilərində 4,47 mq, %, hibridlərdə isə 5,30 mq,% olmuşdur. Ümumi nisbətlərin təhlilində hibridlərdə bu göstəricinin üstün olması aydınlaşmışdır.

## Ədəbiyyat

1. Sadıqova, G.İ. (2009). Simmental hibridlərinin böyümə dinamikası. AMEA-nın Gəncə Regional Elm Mərkəzinin Xəbərlər Məcmuəsi. Gəncə, №40, s.114-117.
2. Lumbunov, S.G., Yeshizhamsoyeva, S.B., Bolotova, ZH.G. (2007). Interyernyye osobennosti i adaptivnyye kachestva gibridov zebu v usloviyakh Zabaykalya. Zhivotnovodstvo Rossii, №5, s.53-54.
3. Erist, L.K., Zaveryukha, A.KH., Mazurovskiy, L.Z., Kosilov, V.I. (1993). Sozdaniye myasnogo tipa simmentalskogo skota. Zootekhniya, № 8, s.2-4.
4. Abbasov, S.A., Əliyev, M.Ə. (2010). Zebuçuluq. Dərslik. Bakı: Hüquq nəşriyyatı, 316 s.
5. Abdullayev, Q.Q., Sadıqova, G.İ. (2009). Hibridlərdə böyümə üstünlüklərinin əsasları. AMEA-nın Gəncə Regional Elm Mərkəzinin Xəbərlər Məcmuəsi. Gəncə, №38, s.23.
6. https://az.wikipedia.org/wiki/Qonur_Qafqaz_mal%C4%B1
7. Davati, D.S., Orang, Ye.M., Abbasov, S.A. (2008). Myasnaya produktivnost gibridov. Natsionalnaya Akademik Nauk Azerb. Gyandzhinskiy Region. Nauch. Tsentr. Sbornik izvestiy., №33. Gyandzha, s.77-80.
8. Draganov, I., Shurkin, G. (2006). Kormoproizvodstvo na sovremennyy uroven. Zhivotnovodstvo Rossii. M., №11, s.11-13.
9. Kosilov, V.I., Salikhov, L.A., Bagirov, N.N., Yusupov, R.S. (1999). Myasnaya produktivnost kastratov kazakhskoy belogolovoy porody i yeyo pomesey s simmentalami i sharole. Zootekhniya, №1, s.25-29.

10. Kugenov, P.V., Stepanov, D.D. (1974). Zebu v sovremennom skotovodstve nekotorykh stran zharkogo klimata. Zhivotnovodstvo, №12, s.26-32.
11. Sadıqova, G.İ. (2010). Hibridləşmənin ət məhsuldarlığına təsiri. ADAU-nun Elmi Əsərlər Toplusu. Gəncə, №2, s.76-77.
12. Sadıqova, G.İ. (2010). Zebu ekoloji mühit şəraitinə dözümlü və yüksək keyfiyyətli məhsuldarlığa malik heyvandır. AMEA-nın Naxçıvan Regional Elm Mərkəzinin Xəbərlər Məcmuəsi. Naxçıvan, s.214-218.
13. Karayev, S.G. (1984). Razvedeniye zebu i zebuvidnogo skota v Dagestane. Molochnoye i myasnoye skotovodstvo, №11.

Göndərildi: 08.05.2022 Qəbul edildi: 15.07.2022

DOI: https://doi.org/10.36719/2707-1146/23/19-24

**Şahmar Məmməd oğlu Məmmədov**
Heyvandarlıq Elmi-Tədqiqat İnstitutu
aqrar elmlər üzrə fəlsəfə doktoru
shahmar56@mail.ru
**Rinat Raviloviç Qadiyev**
Başqırd Dövlət Aqrar Universiteti
kənd təsərrüfatı elmləri doktoru
rgadiyev@mail.ru

# BİR GÜNLÜK CÜCƏLƏRİN VİTAMİNLƏR VƏ DƏRMAN PREPARATLARI İLƏ AEROZOL MÜALİCƏSİ

**Xülasə**

Məqalədə bir günlük cücələrin vitamin və dərman preparatları ilə aerozol müalicəsinin tətbiqi üzrə elmi tədqiqatların məlumatları verilir. A vitamini ilə müalicə edildikdə, bir günlük cücələri yağda həll olunan vitaminlərin aerozolları ilə müalicə etmək mümkün olduğu qənaətinə gəldik. Belə ki, onun ağciyər toxumasında konsentrasiyası aşağı, qanda isə eyni müalicə müddəti ilə suda həll olunan B1 vitamini ilə müqayisədə daha yüksək olmuşdur. Dispergirləşən (dağılan) mayedə farmazinin konsentrasiyasının çoxalması və emal müddətinin artırılması cücələrin ağciyər toxumasında və qaraciyərində antibiotikin konsentrasiyasının artmasına səbəb olmur.

***Açar sözlər:*** *aerozol müalicəsi, dərmanlar, sutkalıq cücələr, yağda həll olunan vitaminlər, farmazin*

**Shahmar Mammad Mammadov**
**Rinat Ravilovich Gadiyev**

## Aerosol treatment of day-old chickens with vitamins and medicines

**Abstract**

The article presents the data of scientific research on the use of aerosol treatment with vitamins and medicines of day-old chickens. When treated with vitamin A, it was concluded that it was possible to treat day-old chickens with aerosols of fat-soluble vitamins, since its concentration in the lung tissue was lower and in the blood was higher compared to water-soluble vitamin B1 with the same duration of treatment. An increase in the concentration of pharmazine in the dispersed liquid and an increase in the duration of treatment do not cause an increase in the concentration of the antibiotic in the lung tissue and liver of chickens.

***Keywords:*** *aerosol treatment, medications, daily chickens, fat-soluble vitamins, pharmazine*

## Giriş

Kənd təsərrüfatı heyvanlarının və quşlarının məhsuldarlığının artırılması müasir elmin prioritet vəzifəsidir.

Quşçuluq məhsullarının istehsalını artırmaq və quşçuluğun davamlı inkişafını təmin etmək üçün sahənin istehsalını, maliyyə qoyuluşlarını və yenidən texniki təchiz olunmasını genişləndirmək kifayət deyil. İnkubasiyaya yararlı və keyfiyyətli yumurta çıxımı, cücələrin çıxarılması və postembrional dövrdə onların inkişafı üzrə elmi əsaslandırılmış texnoloji üsulların hazırlanması və tətbiqi zəruridir.

İnkubasiya yumurtalarının keyfiyyətinin pisləşməsinin əsas səbəbi qabığın çirklənməsidir. Yumurtaların təmizliyinə təsir edən bir sıra texnoloji amillər var. Bunlara daxildir: valideyn sürüsünün dərin döşəmə üzərində və ya qəfəs batareyalarında saxlamaq texnologiyası; yuvaların quruluşu və sayı; yuvaların gigiyenası; yumurta yığımının vaxtı və tezliyi; quşun yaşı; işıqlandırma; döşəmə materiallarının nəmliyi və s. (Del, Ivashkin, 1995: 7-8; Otryganiev, Otryganeva, 1989: 190; Singh, 1990: 65-69).

Valideyn sürüsündən istifadənin səmərəliliyini artırmaq üçün quşçuluq təsərrüfatları çirklənmiş yumurtanı inkubasiya etmək məcburiyyətində qalırlar. Baxmayaraq ki, inkubasiya yumurtalarının sanitariya vəziyyəti, onlardan cücə çıxma qabiliyyəti və alınan cücələrin keyfiyyəti arasında birbaşa asılılıq müəyyən edilmişdir (Baidevlyatov, Olkhovik, Prokudin, 1981: 55-60; Kosenko, Lapko, 2000: 25-26). Yuxarıda göstərilənlərlə əlaqədar olaraq broyler quşçuluq təsərrüfatlarının qarşısında duran aktual vəzifə inkubasiya yumurtalarının və kondisiya cücələrinin çıxışının artırılmasına kömək edən müasir, yüksək effektiv və təhlükəsiz vasitə və üsulların işlənib hazırlanması və uğurla həyata keçirilməsidir.

Buna görə uzun müddətli təsirə malik yeni, effektiv və ekoloji cəhətdən təhlükəsiz dezinfeksiyaedici preparatların tətbiqi cücələrin embrional yaşama qabiliyyətinin yüksəlməsinə səbəb olur.

Quşun genetik potensialının həyata keçirilməsi onun üçün zəruri elmi-əsaslandırılmış saxlanma və yemləmə şəraitinin yaradılmasından, quş ətinin təkrar istehsalı və intensiv texnologiyaların tətbiqindən asılıdır.

Kənd təsərrüfatı quşlarının çoxaldılması yumurtaların inkubasiyası olmadan mümkün deyil. Sənaye quşçuluğunun daha da intensivləşdirilməsi təkcə yumurtaların inkubasiyasının həcminin artması ilə deyil, həm də nəticələrinin keyfiyyət göstəricilərinin yüksəlməsi ilə aparılmalıdır.

Yumurtaların inkubasiyası müasir quşçuluğun mühüm texnoloji proseslərindən biridir. Bir elm olaraq inkubasiyanın məqsədi cücələrin yumurtadan çıxma qabiliyyətini və bir günlük cücələrin keyfiyyətini yaxşılaşdırmaq yollarını tapmaqdır (Dyadichkina, Pozdnyakova, Milekhina, 2014: 171; Burtov, Goldin, Krivopishin, 1990: 239; McDaniel, 1990: 20, 22, 30).

İnkubasiyanın müvəffəqiyyəti, əsasən, xammal – inkubasiya yumurtalarının keyfiyyətindən asılıdır. Bu baxımdan onların keyfiyyətinin artırılmasına böyük diqqət yetirilir. İnkubasiya yumurtalarının keyfiyyəti dedikdə, onların sutkalıq cücələrin çıxışına, yaşama qabiliyyətinə, eləcə də kənd təsərrüfatı quşlarının sonrakı məhsuldarlığına təsir göstərən xüsusiyyətlərinin müəyyən məcmusu başa düşülür (Shtelle, 1977: 54; Brein, 1979: 9).

Hələ 1953-cü ildə tədqiqatçılar Lankaster və Krabb tapdılar ki, formalin 1 $m^3$-ə 45 ml dozada ekpoziyza müddəti 20 dəqiqə və 21°C temperaturda S.Pullorumu yumurta qabığında öldürmək üçün istifadə edilə bilər. Bu mövzuda fəal tədqiqatlar hələ ötən əsrin 60-80-ci illərində müxtəlif alimlər tərəfindən aparılıb və təqdim edilib. İnkubator sexində formalin istifadəsinə dair tövsiyələr SSRİ Kənd Təsərrüfatı Nazirliyinin Baş Baytarlıq İdarəsi tərəfindən 8 dekabr 1968-ci il tarixdə təsdiq edilmiş baytarlıq dezinfeksiya, dezinvaziya, dezinseksiya və deratizasiya təlimatlarına daxil edilmişdir.

Rusiya Kənd Təsərrüfatı Akademiyasının ÜETQTİ-nun tövsiyələrinə əsasən yüksək dispersli aerozol şəklində 37% sulu formaldehid məhlulu tətbiq etmək olar. Lazımi konsentrasiyalı formaldehid aerozolu xüsusi generatorların (SAGlar və s.) köməyi ilə hər 1$m^3$ kameraya 25-30 ml formalin püskürdülməsi ilə əldə edilə bilər.

Fiziki dezinfeksiya vasitələrinə yüksək temperatur və ultrabənövşəyi şüalar daxildir. Kimyəvi vasitələrə – formaldehid, yod, ozon, marqans, xloramin, hidrogenperosid və s., bioloji vasitələrə isə antibiotiklər – mikrobları öldürən göbələk məhsulları daxildir.

Qaz dezinfeksiyası dezinfeksiyaedici maddə qaz halında olduqda deyilir; aerozol – kiçik damlalar şəklində havada dayandırıldığı zaman; yaş dezinfeksiya – məhlula yumurtaları batırdıqda.

B.F.Bessarabovun məlumatına görə inkubasiyanın ilk günlərində embrionların ölümlərinin xeyli faizi infeksiyalardan ibarətdir. Bu yoluxmaların 80%-i yumurtaların içərisinə qabıq vasitəsilə daxil olan müxtəlif xəstəlik mikrobları və yalnız 20%-i quşun reproduktiv orqanları ilə əlaqə yaradır (Bessarabov, 1983: 196).

Yumurtaların bakterial çirklənməsini azaltmaq üçün yumurtaların dərin emalı üsulundan istifadə olunur.

İnkubasiya yumurtalarının dərin dezinfeksiyasına görə eritromisin, morfotsiklin, tetrasiklin, neomisin, tilozin emalının müsbət təsiri barədə məlumatlar vardır (Kuwiyasa, 1967: 57-64).

V.D.Sokolov və Q.E.Afanasyeva inkubasiya yumurtalarının dərin emalı üçün dezinfektant kimi xloreksidin bi-qlyukonat (0,02) və ya 2-B kationatı məhlullarından istifadə etmişlər. Təcrübələrin nəticələri göstərdi ki, bu preparatların dərin emalı respirator mikoplazmoz, kolibakterioz və pulloroz xəstəliyini 3-4 dəfə azaldır.

M.M.Kovalev damazlıq yumurtaların və inkubatoriyanın hava kanallarının, inkubasiya və çıxış şkaflarının sanasiyası üçün uzunmüddətli səthə aktiv təsiredici dezinfektant BB-1 və virusa qarşı köpük sanatoru BB-5 uzunmüddətli təsirini təklif edir. Bu preparatların tətbiqi təsərrüfatın epizootik vəziyyətini xeyli yaxşılaşdırmağa imkan vermiş, cücələrin məhsuldarlığı artmış, zootexniki çıxdaşların sayı azalmışdır. Ev quşlarının salamat saxlanılması 1,6% artmışdır.

"Bakterisid" preparatı kation səthi aktiv maddələr qrupuna aiddir və sarımtıl rəngli pastavari maddədir (Nikolaenko, 2004: 18). Aktiv təsir edən maddə dördüncü ammonium birləşməsidir (4-cü əvəz edilmiş ammonium duzları). Yumurtalar inkubasiya olunmazdan əvvəl iri dispersli aerozol ilə çiləmə vasitəsi ilə aparılır. Yumurtaları məhlulda 3-5 saniyə saxlamaq olar. Tək bir dezinfeksiyadan sonra bütün inkubasiya dövrü, yumurtaların səthi və inkubatorların divarları pulloroz və kolibakterioz patogenlərindən təmizlənmişdir ki, bu da dərmanın uzunmüddətli təsirini təsdiqləyir. Təcrübə qruplarında cücələrin yumurtadan çıxma qabiliyyəti 1,5-4,5%, quşların salamat saxlanılması 2-4%, diri çəki artımı 7-9% yüksək olmuş, embrion patologiyası hallarının sayı azalmış, inkubasiyanın son günlərində embrionların ölümü azalmışdır (Klimov, Karshin, Mikhailova, 2013: 48-50; Brake, Sheldon, 1990: 517-525).

Tədqiqatçılar tərəfindən "Bakterisid−70" preparatını öyrənərkən yüksək bakterisid xüsusiyyətlərinə malik nəticələr əldə edilmişdir (Shchedrov, 2005: 48-49). Dərman (70%) qəhvəyi pastavari kütlədir. "Bakterisid−70" preparatının uzunmüddətli təsiri 1 ay ərzində qeydə alınmışdır. Bu preparatla 30-60 dəqiqədən sonra yumurtaları dezinfeksiya etmək üçün 0,05%-li sulu məhlul şəklində aerozol kimi istifadə etmək tövsiyə olunur. Quş damlarında yumurtalar toplanandan sonra isə 0,1% məhlulla inkubatora qoyulmazdan əvvəl dezinfeksiya edilmişdir. Nəzarət qrupu formaldehidlə işlənmişdir. Nəticədə, bütün tədqiqat müddətində bakterial infeksiyanın törədiciləri ayırd edilməmişdir ki, bu da antiseptikin təsirini təsdiq edir. Təcrübə qruplarında cücələrin yumurtadan çıxma qabiliyyəti nəzarət qrupları ilə müqayisədə 2,4-2,6% çox olmuşdur. Təcrübədə yaşı 20 günə qədər olan cücələrin salamat saxlanılması da 2,3-2,5% çox olmuşdur (Gadiev, 2005: 547).

Ev quşlarının yetişdirilməsi və saxlanmasının müasir texnologiyası aerozollar şəklində kimyəvi və bioloji preparatlardan istifadə edərək quşların müalicə-profilaktika və baytar-sanitariya müalicəsi sistemini təmin edir. Hazırda preparatların tətbiqinin aerozol metodları kifayət qədər səmərəli hesab olunur, çünki preparatların aplikasiya yerinə (ağciyərlərə) çatdırılmasından əlavə, preparatların qana sürətlə daxil olmasını da təmin edir. Bundan başqa, dərman preparatlarının inqalyasiya (tənəffüs) edilməsi onların mədə şirəsi ilə əlaqəsini aradan qaldırır ki, bu da dərmanların məqsədli təyinatla daha tam istifadəsinə imkan yaradır (Gadiev, Charyev, 2015: 164-166).

Xəstəliklərin qarşısının alınması məqsədi ilə profilaktik olaraq sutkalıq cücələr üzərində təkcə vaksinlərlə deyil, həm də digər baytarlıq preparatları ilə də aerozol müalicəsi aparılır. Məsələn, soyuqdəymə xəstəliklərinin qarşısının alınması məqsədilə cücələr farmazin, tilan ilə işlənir. İnkubasiya yumurtalarında vitamin çatışmazlığı olduğu halda, yetişdirilmənin ilk günlərində cücələr vitamin və ya vitamin komplekslərinin aerozolları ilə müalıcə olunur (Krivopishin, Goldin, Dyadichkina, 2001: 4).

Bunu nəzərə alaraq sutkalıq cücələrin vitamin və dərman preparatları ilə aerozol müalicəsinin texnoloji parametrlərini müəyyən etmək üçün təcrübələr apardıq.

Cücələrin müalicəsi kameranın qapalı germetik həcmində (həcmi 3 $m^3$) yüksək dispersli aerozollar yaradan mikro-SAQ-larla aparılmışdır. Hər mikro-SAQ-ın tutumu 100 ml, məhsuldarlığı 2-3 ml/dəq., 3 $kq/sm^2$ təzyiqdə. Kamera 2 hissədən ibarətdir: yuxarı hissə – operator tərəfindən taradan tökülən cücələrin qəbulu üçün, aşağı hissə – kamera qablarından müalicə edilmiş cücələrin qəbulu üçün. Hər iki hissə aşağıdan eyni vaxtda bir tutacaqla idarə olunan hərəkətli qapaqlarla bağlanır. Tutacaq qaldırıldıqda, hər iki qapaq açılır və cücələr aşağı düşür: yuxarı hissədən kamera tarasına, aşağı hissədən stenddə quraşdırılmış qablara, yəni kamera qoşa şlüz kimi hazırlanmışdır. Bir qaba 100 başa qədər cücə yerləşir.





1-ci təcrübədə (Cədvəl 1.) baytarlıq preparatlarının aerozollarının xüsusiyyətlərini öyrəndik. Onlar şərti olaraq iki qrupa bölünmüşdür: özlülüyü 5...10 sPe olan sulu məhlullar (tilan, farmazin, vitamin B1) və özlülüyü 50...70 cPa olan yağ məhlulları (vitamin A, D, E və trivit).

***Cədvəl 1.***

**Aerozolun parametrləri**

| Dərman preparatları | Havanın təzyiqi, MPa ml/dəq | Mayenin sərfi, ml/dəq | Aerozol konsentrasi-yası, mq/l* | Hissəciklərin orta ölçüsü, mkm | Hissəciklərin payı 1... 10 mkm, % |
|---|---|---|---|---|---|
| Farmazin, sulu məhlul | 0,3 | 2…5 | 0,1…0,3 | 3,0±1 | 50…70 |
| Vitaminlər A, D və E, yağlı məhlul | 0,3 | 3…5 | 1,0…3,0 | 3,0±1 | 50…70 |

**Aerozolun konsentrasiyası quru maddəyə görə verilmişdir, çünki kamerada havanın rütubəti 80% olduqda hissəciklərin tez quruması baş verir.*

Cədvəldəki məlumatların təhlili göstərir ki, 300 $m^3$ kameraya iki mikro-SAQ tələb olunan hissəcik ölçüsü və aerozol buludunun münasib forması olan "aspirabel" aerozol yaradır (Piestun, Shinder, Ruzal, Halevy, Brake, Yahav, 2008: 1516-1525).

Bundan əlavə, təcrübə zamanı müəyyən edilmişdir ki, farmazin antibiotikinin aerozollaşdırılmış nümunəsinin spesifik aktivliyi ilkin məhlulun aktivliyindən əhəmiyyətli dərəcədə fərqlənmir. Bu, antibiotiklərin kifayət qədər davamlı maddələr olması və buna görə də tərkibində stabilizatorlar və antioksidantlar olan xüsusi həllediciləri tələb olunmaması ilə izah edilə bilər. Vitaminlər, həmçinin dispersiyaya davamlı maddələr kimi təsnif edilə bilər (Yalchin, Babacanoglu, Guler, Aksit, 2010: 114-183).

2-ci təcrübədə B1 vitamini ilə aerozol müalicəsinin nəticələri öyrənilmişdir. Cücələrin bədən səthində və ağciyər toxumasında 5 dəqiqəlik müalicə ilə B1 vitamininin miqdarı 2 dəqiqəlik ekspozisiya ilə müqayisədə 1,81 və 1,5 dəfə (18,0 və 9,0 mkq) yüksək olmuşdur. Qanda, əksinə, 5 dəqiqəlik əməliyyat zamanı onun miqdarından az, 2 dəqiqəlik ekspozisiyanın nəticəsi ilə müqayisədə 1,09 dəfə (0,3 mkq) aşkar edilmişdir.

Aerozol müalicəsi nəticəsində sutkalıq cücələrin orqanlarında A vitamininin konsentrasiyasını öyrəndik. Disperqləşmə üçün $10^5$ İU/mq aktivliyə malik A vitamininin yağlı məhlulunun farmakopiya formasından istifadə edilmişdir. Nəticədə, ağciyər toxumalarında, nəfəs borusu və qanda vitamin A konsentrasiyasının heterogenliyi aşkar edilmişdir: 0,6; 0,7 və 2,5 IU/ml.

Əldə edilən məlumatları təhlil edərək, bir günlük cücələrin yağda həll olunan vitaminlərin aerozolları ilə müalicəsinin mümkünlüyü barədə nəticəyə gəlmək olar. Eyni zamanda, eyni müalicə müddəti ilə suda həll olunan vitamin B1 ilə müqayisədə ağciyər toxumasında A vitamininin konsentrasiyası 5 dəfə aşağı, qanda isə təxminən 4 dəfə yüksək olmuşdur (Yildirim, Yetisir, 2004: 211-216).

4-cü təcrübənin məqsədi müalicə müddətinin və dispersasiya olunan mayedə farmazinin konsentrasiyasının ağciyər toxumasında və qaraciyərdə onun tərkibinə təsirini öyrənmək idi.

Cücələrin orqanlarında farmazinin konsentrasiyası bioloji üsulla müalicədən 2 saat sonra müəyyən edilmişdir (Cədvəl 2.).

*Cədvəl 2.*

**Cücələrin orqanlarında farmazinin miqdarı**

| Qruplar | Müalicə müddəti, dəq. | Farmazinin konsentrasiyası | | |
|---|---|---|---|---|
| | | Məhlulda, % | Ağciyər toxumasında daha çox, mkq/q | Qara ciyərdə daha çox, mkq/q |
| 1 | 2 | 20 | 5,0 | 10,0 |
| 2 | 5 | 20 | 2,5 | 2,5 |
| 3 | 5 | 40 | 5,0 | 6,0 |

Cədvəldəki məlumatlar göstərir ki, dispergirləşən (dağılan) mayedə farmazinin konsentrasiyasının artması və müalicə müddətinin artması cücələrin ağciyər toxumasında və qaraciyərində antibiotik konsentrasiyasının artmasına səbəb olmur. Cücələri 2 dəqiqə ərzində 20%-li farmazin məhlulu ilə müalicə etmək daha effektivdir (Baidevlyatov, Olkhovik, Prokudin, 1981: 55-60).

Cücələr tərəfindən qəbul edilən dərmanın dozasını qiymətləndirərkən, oral qəbul normalarını əsas götürdük. Mikoplazmozun qarşısını almaq üçün farmazinin istifadəsi təlimatına uyğun olaraq, cücələri qidalandırmaq üçün 0,1%-li sulu məhluldan istifadə olunur. İlk gündə suyun içirilmə prosesində (5 ml) cücə üçün antibiotik dozası 5 mq-dır. Bununla belə, mədə şirəsi ilə inaktivasiya və qidanın mədə-bağırsaq traktından sürətlə keçməsi səbəbindən dərman preparatlarının həzm edilməsi, adətən 10%-dən çox olmur (Kosenko, Lapko, 2000: 25-26).

## Nəticə

Əldə edilən tədqiqatların nəticələrini təhlil edərək belə nəticəyə gəlmək olar ki, hazırlanmış aerozol kamerası bir günlük cücələri lazımi baytarlıq preparatlarının (vaksinlər, vitaminlər, antibiotiklər) aerozolları ilə müalicə etməyə imkan verir. Eyni zamanda ətraf mühitin çirklənmədən qorunması təmin edilir. Bundan əlavə, kameranın konstruksiyası ondan inkubasiyanın axın texnologiyasında istifadə etməyə imkan verir və bununla yanaşı cücələrin nəqliyyat vasitələrinə yüklənməsinin mexanikləşdirilməsi mümkündür.

## Ədəbiyyat

1. Del, V., Ivashkin, V. (1995). Disinfection of eggs with azone. Poultry farming, No.5, p.7-8.
2. Otryganiev, G.K., Otryganeva, A.F. (1989). Incubation technology. 3rd edition revised and additional. Moscow: Rosagropromizdat, 190 p.
3. Singh, A. (1990). Factors affecting characteristics of egg shell and shell membranes. Poultry Guide, Vol.27, № 9, p.65-69.
4. Dyadichkina, L.F., Pozdnyakova, N.S., Milekhina, T.A. and others. (2014). Biological control during incubation of poultry eggs. Methodical instructions, Sergiev Posad, 171 p.
5. Burtov, Yu.Z., Goldin, Yu.S., Krivopishin, I.P. (1990). Egg incubation: a Handbook. M.: Agropromizdat, 239 p.
6. McDaniel, G.R. (1990). Hatchability: many factors affect results. Poultry Dig., T.49, № 9, p.20, 22, 30.

7. Shtelle, A.P. (1977). The quality of eggs and ways to improve it review informal. M.: VNIITEISH, 54 p.
8. Brein, H. (1979). Clean eggs the vital stage. Poultry Ind., Vol.13, № 2, p.9.
9. Bessarabov, B.F. (1983). Veterinary and sanitary measures for the prevention of bird diseases. M.: Rosselkhozizdat, 196 p.
10. Kuwiyasa, Ch. (1967). Serological response of chickens naturally infected with Mycoplasma galliseptioum and the effect of tylosin on these responses. Natn. Inst., Anim Heth. Qt., Tokyo, № 7, p.57-64.
11. Klimov, M., Karshin, S., Mikhailova, A. (2013). Production tests of the drug Bactericide-40 during egg incubation. Poultry farming, No.1, p.48-50.
12. Brake, J., Sheldon, B.W. (1990). Effect of a quaternary ammonium sanitizer for hatching eggs on their contamination, permeability, water loss, and hatchabiiity. Poultry Sc., T.69, № 4, p.517-525.
13. Gadiev, R.R. (2005). Broiler. In the collection: Bashkir Encyclopedia, Vol. 7, Ufa, p.547.
14. Gadiev, R.R., Charyev, A.B. (2015). Productive qualities of broiler chickens with different growing technologies. Proceedings of the Orenburg State Agrarian University, No.6 (56), p.164-166.
15. Krivopishin, I.P., Goldin, Yu.S., Dyadichkina, L.F. and other. (2001). Guidelines for the incubation of poultry eggs. Sergiev Posad, 46 p.
16. Piestun, Y., Shinder, D., Ruzal, M., Halevy, O., Brake, J., Yahav, S. (2008). Thermal Manipulations During Broiler Embryogenesis: Effect on the Acquisition of Thermotolerance. Poultry Science, Vol. 87, p.1516-1525.
17. Yalchin, S., Babacanoglu, E., Guler, H.C., Aksit, M. (2010). Effects of incubation temperature on hatching and carcass performance of broilers. World’s Poultry Science Journal, №66, p.87-94, 114-183.
18. Yildirim, I., Yetisir, R. (2004). Effects of different hatcher temperatures on hatching traits of broiler embryos during the last five days of incubation. South African Journal of Animal Science, № 34, p.211-216.
19. Baidevlyatov, A.B., Olkhovik, L.A., Prokudin A.F. et al. (1981). Influence of microbes on the safety and live weight of chickens. Poultry farming, Issue 32, p.55-60.
20. Kosenko, O., Lapko, A. (2000). Disinfectant for processing hatching eggs. Poultry farming, No.1, p.25-26.

Göndərildi: 21.05.2022 Qəbul edildi: 20.07.2022

DOI: https://doi.org/10.36719/2707-1146/23/25-31

**Səliqə Qalib qızı Qazi**
AMEA Zoologiya İnstitutu
seliqeqazi08@gmail.com

# ŞƏKƏR ÇUĞUNDURU AQROSENOZLARINDA YAYILMIŞ MƏNƏNƏLƏR

**Xülasə**

Şəkər çuğunduru son illər Respublikamızda ciddi önəm verilən əkinçilik sahələrinə çevrilmişdir. İqtisadi cəhətdən gəlirli olan bu sahənin inkişafı üçün dövlət tərəfindən hərtərəfli tədbirlər həyata keçirilir. Respublikamızda şəkər çuğunduru əkinlərinin hər il genişləndirilməsi ilə əlaqədar olaraq, bu aqrosenozda onun zərərvericilərinin növ tərkibinin öyrənilməsinin mühüm əhəmiyyəti vardır. Belə ki, çuğundur əkinlərində zərərvericilərin növ tərkibinin öyrənilməsi, ciddi məhsul itkisinə səbəb olan və ərazidə geniş yayılan təsərrüfat əhəmiyyətli növlərin üzə çıxarılması və onlara qarşı səmərəli mübarizə tədbirlərinin hazırlanması baxımından çox vacibdir.

***Açar sözlər:*** *aqrosenoz, şəkər çuğunduru, çuğundur yarpaq mənənəsi, çuğundur kök mənənəsi, vegetasiya*

**Saliga Galib Gazi**

## Distributed fungi in sugar beet agrocenoses

**Abstract**

In recent years, sugar beet has become an important agricultural field in our Republic. Comprehensive measures are taken by the state for the development of this economically profitable sector. In connection with the annual expansion of sugar beet plantations in our republic, it is important to study the species composition of its pests in this agrocenosis. Thus, it is very important to study the species composition of pests in beet crops, to identify economically important species that cause serious crop loss and are widespread in the area, and to prepare effective control measures against them.

***Keywords:*** *agrocenoses, Beta vulgaris, Aphis fabae, Pemphigus fuscicornis, vegetation*

## Giriş

Şəkər çuğundurunun meyvə köklərinin kütləsi, vegetasiyanın bütün mərhələlərində, yəni məhsul yığımına qədər artmaqda davam edir. Yarpaq kütləsinin inkişafı isə müəyyən həddə çatdıqdan sonra dayanır. Adətən bu hal vegetasiyanın sonuna yaxın, yəni sentyabrın əvvəllərində baş verir. Vegetasiyanın əvvəllində yarpaq kütləsi kökümeyvənin kütləsini üstələyir, sonunda isə bunun əksi baş verir (Berim, 2009). Buna görə də şəkər çuğunduru vegetasiyasının bütün mərhələlərində ziyanvericilər tərəfindən zədələnir.

***Cədvəl 1.***
**Şəkər çuğundurunun vegetasiya dövrü**

| Ay | Mart (5°C) | | | Aprel (12°C) | | | May (15°C) | | | İyun (28°C) | | | İyul (30°C) | | | Avqust (35°C) | | Sentyabr (20◦C) | | | Oktyabr (18◦C) | | | Noyabr (15◦C) | | |
|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|
| dekadalar | I | II | III | I | II | III | I | II | III | I | II | III | I | II | III | I | II | I | II | III | I | II | III | I | II | III |
| Çuğundurun vegetasiya dövrü | Toxum səpini | | | | Cücərti | | Yarpaq | | | | | | | Kökümeyvə | | | | | Şəkərin maksimal həddi | | | | Yığım | | | - | |

Şəkər çuğunduru aqrosenozlarında rast gəlinən növlər içərisində Aphididae (mənənələr) fəsiləsinə mənsub çuğundur yarpaq mənənəsi (A.fabae Scop.) olmuşdur ki, bu növ bitkinin ilk cücərtilərindən, yarpaq kobudlaşanadək sahələrdə fəaliyyət göstərərək bitkilərə xeyli ziyan vururlar. Sahələrdə eyni zamanda çuğundur kök mənənəsinə də (*Pemphigus fuscicornis* Koch.) rast gəlmək olur (Podyonov, 1980: 79).

***Aphis fabae* Scopoli** – Çuğundur yarpaq mənənəsi
Dəstə: Hemiptera Linnaeus, 1758
Fəsilə: Aphididae
Yarımfəsilə: Aphidinae
Cins: Aphis
Növ: *Aphis fabae* Scopoli

Çuğundur yarpaq mənənəsinə şəkər çuğunduru əkilən hər yerdə rast gəlinir.

Bu ziyanverici Cənubi Amerikada, Rusiyada, Orta Asiyada, Qazaxıstanda, Qafqazda, Belarusiyada, Ukraynada və s. ölkələrdə yayılmışdır (Petrukha: 372-402) .

Polifaqdır növdür, şəkər çuğunduru ilə yanaşı, boranı, badımcan, lobya, pomidor və s. bitkilərə ziyan vurur. Çuğundur yarpaq mənənəsi xırda cücüdür, qara, ya da tünd yaşıl olub parlaqdır. Yumurtasını bitki qalıqlarının və alaq otlarının üzərinə qoyur. Yazda havalar isinəndə sürfələr yumurtadan çıxır. Partogenetik yolla çoxalaraq, 2-4 nəsil verir. Yumurtadan çıxan qanadlı fərdlər çuğundur və digər ot bitkilərində məskunlaşmışlar. Bir neçə nəsildən sonra qanadsız dişi fərdlər görünür. Bunlar da iyun ayının əvvəllərində çuğundur əkinlərinə ziyan vururlar. Bir mövsüm ərzində çuğundur yarpaq mənənəsi 17-yə qədər nəsil verə bilir. Mənənə bitkinin yarpaqları və gövdəsinin şirəsi ilə qidalanır, əsasən yarpağın alt tərəfində olur. Yoluxmuş bitkilər saralır, içəridən büzüşür, güclü yoluxmadan bitki quruyur. Məhsuldarlıq aşağı düşür, toxumun keyfiyyəti azalır. Yayın axırında isə ziyanverici yasəmənə, qamışa keçir (Pavlyuk, 1975: 23) .

Mənənə sürfə mərhələsində qışlayır. Aşağı temperatura çox davamlıdır. Yumurtalar 32°C temperaturda belə məhv olmurlar. Aprel və may aylarının quru havası Aphis fabae növünün çoxalması üçün əlverişli şərait yaradır. Kütləvi artma ən çox iyulda təsadüf olunur. Növün inkişafı üçün optimal orta temperatur 20-25°C, nisbi rütubət isə 70-90°C təşkil edir (Mamontova, Kosmachevski, 1976: 64).

***Cədvəl 2.***
***Aphis fabae*-nın fenologiyası**

| **Ay** | **mart** | | | **aprel** | | | **may** | | | **iyun** | | | **iyul** | | | **avqust** | | | **sentyabr** | | | |
|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|
| Ongün lük | 1 | 2 | 3 | 1 | 2 | 3 | 1 | 2 | 3 | 1 | 2 | 3 | 1 | 2 | 3 | 1 | 2 | 3 | 1 | 2 | 3 | Qışlama |
| Mərhələ | i | i | i | i | i | i | i | i | i | i | i | i | i | i | i | | | | | | | |
| | | | | | | | y | y | y | y | y | y | y | y | y | | | | | | | |
| | | | | | | | | s | s | s | s | s | s | s | s | s | s | s | | | | |
| | | | | | | | | | | | | | n | n | n | n | n | n | n | n | n | |
| | | | | | | | | | | | | | | | qi | qi | qi | qi | qi | qi | qi | |

Qeyd: i – imaqo, y – yumurta, s – sürfə, n – nimfa, qi – qışlayan imaqo




**Şəkil 1. *Aphis fabae*-nın say dinamikası**

Şəkil 1-dən göründüyü kimi 1 m$^2$ stasionar sahədə mənənələrin orta sıxlığı iyul ayında maksimal həddə çatır. Bir bitkidə mənənənin ən yüksək sıxlığı 2014-cü ildə qeydə alınmışdır. Güclü yağışlar ziyanvericinin sayının azalmasına gətirib çıxarır.

Təbiətdə bu növlə qidalanan entomofaqlar çoxdur. Məsələn, *Coccinella septempunctata* L, C. Quinquepunctata L., *Adalia bipunctata* L., *A.decimpunctata* l., *A.variegate Goeze*, *Calvia quatuordecimpunctata* L. və başqaları.

Dəstə: Hemiptera Linnaeus, 1758
Fəsilə: Aphididae
Cins: Pemphigus Hartig, 1839
Növ: *Pemphigus fuscicornis* (Koch, 1857)

*P.fuscicornis* Koch növü adətən torpaqda qışlayır. Partenogenetik dişilərin bədənləri qanadsız olub, sarımtıl ağ rəngdədir. Uzunluğu 2-2,5 mm olub, yumurtavaridir. Arxa hissəsi ağımtıl mumla və

tükcüklərlə örtülmüşdür. Gözləri üç fasetli olub, qırmızı rəngdədir. Sürfələr sarımtıl boz və ya yaşılımtıl sarı olub, dörd buğumlu bığlara malikdir. Uzunluğu 0,7 mm, eni 0,2-0,3 mm-dir. Yazda sürfələr yumurtalardan çıxır, bu da onların yayılmasında böyük rol oynayır. *P.fuscicornis* avqust-sentyabr ayında 10-12 nəsil verir. Avqustun sonlarında partenogenetik dişilərdən əlavə cinsiyyət daşıyan qanadlı fərdlər çıxır. Mənənə kaloniyaları çuğundurun kök yumrularında, tərəkimilər fəsiləsindən olan alaq otlarında rast gəlinir (Zemtsov, 2017: 2-5).

Mənənə kökdən şirəni sorur, bitki torpaqda rütubət çatışmazlığından solur və məhv olur. Quraqlıq zamanı köklər quruyur, çürüməyə başlayır və asanlıqla torpaqdan çıxır. Bu zaman məhsuldarlıq hər hektarda 50 sentnerə qədər, şəkərliliyin dərəcəsi isə 3-5% -ə qədər azalır (Zverezomb-Zubovsky, 1956: 276).

Mənənələrin tam inkişaf tsikli eyni bitkidə getmir. Əvvəlcə *Eupopulus* y cinsinin ətirli qovaq (*Tacamalacea*) növündə rast gəlinir. Sonra isə sirkan, çuğundur və s. bitkilərə keçir (Doroshina, 1981: 124; Qazi, 2016: 51-58).

V.A.Mamontova və A.S.Kosmachevski tərəfindən müəyyən olunmuşdur ki, mənənələr natamam dövriyyə ilə yalnız aralıq sahiblərdə (bitkilərdə) inkişaf edir. Yazda dişilər 30-a yaxın sürfə doğurlar və bununla da ilkin yaz nəslini formalaşdırır. Eyni zamanda, embrionlar inkişaf edir, sürfələr çox qısa müddətdə doğulur, daha sonra dişilər məhv olur. Yayda isə dişilər uzun müddət yaşayır, gündə 3-7 sürfə doğurlar. Torpağın temperaturundan asılı olaraq, yay nəsli 55-60 gün müddətinə inkişaf edir. Yayın axırı, payızın əvvəlində sürfələr nimfaya çevrilir, onlardan isə qanadlı dişilər əmələ gəlir, sonra qovağa keçir. Qovağın qabığında, qabığın çatlarında və s. gizli yerlərdə cinsiyyət daşıyan fərdlər qanadsız, qidalanmayan erkək və dişiləri əmələ gətirirlər. Mayalanmadan sonra dişilərin hər biri bir yumurta qoyub ölürlər. Yazda qışlamış yumurtalardan sürfələr çıxır.

Digər qışlama torpağın 5-25 sm dərinliyində baş verir. Yazda torpağın temperaturu 7-9ºC-yə qədər yüksəldikdə oyanırlar. Növün yayılması sürfələrin hesabına baş verir. Yem bitkilərinin, mərvinin, çuğundurun köklərini tapan sürfələr kiçik kökcüklərə tərəf yönəlir və onlara yapışırlar.

Sürfələr çuğundurun axtarışı zamanı torpağın üzərində aktiv miqrasiya edə bilirlər. Bundan başqa, külək və kənd təsərrüfatı texnikası ilə yayıla bilirlər. Ümumiyyətlə, mənənələrin kütləvi miqrasiyası iyun, avqust aylarında baş verir. Sürfələr torpağın yaxşı qızması ilə gecələr daha aktiv olurlar. Mənənələrin çoxalma tempi torpağın mexaniki tərkibi, rütubət, temperatur və hava rejimindən asılıdır. Şumlanmış torpaqlarda yayılma daha tez baş verir, bərk torpaqlar yayılma üçün əlverişli deyildir. Mənənə populyasiyası çox tez çoxalır və onu müəyyənləşdirənə qədər xeyli ziyan vurur. Sürfələrin yayılmasının qarşısını yüksək rütubət, yəni yağıntılar, suvarma alır. 23-25ºC temperaturda dişilər gün ərzində 15-30 yumurta qouyur, 6-10 gündən sonra yetkin fərdə çevrilir. 18-20ºC də 3-5 yumurta qoyur, 20 gündən sonra yetkin fərdə çevrilir. Erkən payız soyuqları düşdükdə mənənələrin sayı azalır (10).

Mənənələrlə yoluxmanın diaqnostik əlaqələri kök ətrafında və bitkinin ətrafındakı torpaqda ağ ləkələrin olması ilə təyin olunur. Mənənələrlə yoluxma zamanı bitkilərin yarpaqları saralır, onların inkişafı dayanır. Zədələnmiş kökcüklər məhv olur, kök meyvəsi büzüşür. Daha çox ziyan görmüş, zədələnmiş kökümeyvələr torpaqdan asanlıqla çıxır. Onlar emal və yem üçün yararlı sayılmır.

Mənənələr eyni zamanda çuğundurun mozaikası virus xəstəliyinin daşıyıcısıdır. Mənənənin inkişafında yay fəslində əsas rolu temperatur oynayır. Bu zaman rütubət ikinci dərəcəyə keçir. Çünki istilər zamanı bitkinin şirəsini sormaqla rütubəti konpensasiya edə bilir. Bu, adətən, quraqlıq zamanı müşahidə olunur ki, bu zaman onların zərərvericiliyi daha da artır. Havanın optimal rütubəti 50-55%, temperatur isə 20-25ºC olduqda mənənənin 1 nəsli 7-10 günə inkişaf edir. Leysan yağışlar mənənəni bitkinin üzərindən yuyaraq çoxalmanın qarşısını alır.

Çuğundur kök mənənəsinin ziyanvericiliyi tədricən nəzərə çarpır. Sayı artdıqca bitkinin yarpaqları saralır və inkişafı demək olar ki, dayanır. Zərərverici ilə zədələnmiş kök sıradan çıxır ki, bu da meyvəkökün məhvinə səbəb olur. Zərərverici ilə güclü zədələnmiş meyvəkökdə 6000 və daha çox mənənə saymaq mümkündür.

Ziyanvericinin məhvində yırtıcı cücülərin böyük rolu vardır. Onlar hər gün onlarla, hətta yüzlərlə mənənə sürfəsini məhv edir. Bunların içərisində parabüzənlər, qızılgözlər daha aktivdir. Mənənələri həmçinin hörümçəklər, gənələr və taxtabitilər də məhv edirlər (Qazi, 2015: 78-86, Gazi, 2020: 17-19) .

***Cədvəl 3.***

***Pemphigus fuscicornis*-ın fenologiyası**

| **Ay** | **mart** | | | **aprel** | | | **may** | | | **iyun** | | | **iyul** | | | **avqust** | | | **sentyabr** | | | Qışlama |
|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|
| Ongünlük | 1 | 2 | 3 | 1 | 2 | 3 | 1 | 2 | 3 | 1 | 2 | 3 | 1 | 2 | 3 | 1 | 2 | 3 | 1 | 2 | 3 | |
| Mərhələ | | i | i | i | i | i | i | i | i | i | i | i | i | i | | | | | | | | |
| | | | | | | y | y | y | y | y | y | y | y | y | y | | | | | | | |
| | | | | | | | s | s | s | s | s | s | s | s | s | s | s | | | | | |
| | | | | | | | | | | | | | n | n | n | n | n | n | n | n | n | |
| | | | | | | | | | | | | | | | qi | qi | qi | qi | qi | qi | qi | |

Qeyd: i – imaqo, y – yumurta, s – sürfə, n – nimfa, qi – qışlayan imaqo




**Şəkil 2.**

Şəkil 2-dən göründüyü kimi, 1 $m^2$ stasionar sahədə mənənələrin orta sıxlığı iyul ayında maksimal həddə çatır. Bir bitkidə mənənənin ən yüksək sıxlığı 2016-cı ildə qeydə alınmışdır.




**Mənənələrin zərərvermə dərəcəsinin qiymətləndirilməsi**

Çuğundur yarpaq mənənəsi ən böyük ziyanı yem çuğunduruna, şəkər çuğunduruna, paxlalı bitkilərə, kartofa, günəbaxana, pomidora vurur. Yabanı bitkilərdən isə Papaver somniferum L., Arcitum tomentonum Mill., Cirsium arvensa L. və s ziyan vururlar. Deməк olar ki, bu növ 200-dən çox mədəni və yabanı bitki növünü yoluxdurur.

Fitofaqların zərərvurma dərəcəsi həm çöl say miqdarının hesaba alınması, həm də alınmış nəticələrin statistik işlənməsini özündə əks etdirən metodlarla müəyyənləşdirilmişdir. Yarpaq mənənəsi tərəfindən zədələnən çuğundur yaşıl hissələrin zədələnmə intensivliyi aşağıdakı kimi müəyyən edilmişdir. Əvvəlcə yarpaqların ümumi sayı, sonra zədələnmiş yarpaqların sayı müəyyənləşdirilmişdir. Zədələnmə dərəcəsi ümumi qəbul edilmiş 5 ballıq şkalaya əsasən qəbul edilmişdir.

- 1 bal – yarpaq ayasının 1%-i zədələndikdə;
- 2 bal – yarpaq ayasının 6%-dən 25%-dək zədələndikdə;
- 3 bal – yarpaq ayası 25%-dən 50%-ədək zədələndikdə;
- 4 bal – yarpaq ayası 51%-dən 75%-dək zədələndikdə;
- 5 bal – yarpaq ayası 75%-dən çox zədələndikdə.

Hesablama üçün çuğundur əkilmiş sahələrdə yuxarıda verilmiş zədələnmə faizinə malik yarpaqların orta sayı götürülmüşdür. Yarpaqların zədələnmə intensivliyi bu düsturla hesablanır:

$$P=(nV)100\%)/5N$$

Burada:
P – zədələnmə intensivliyi
N – yarpaqların ümumi sayı (ədədlə)
N – zədələnmə balın uyğun yarpaqların sayı
V – zədələnmə balı

Götürdüyümüz stasionar sahənin 1m$^2$-də təxminən 20 ədəd çuğundur əkilmişdir. Hər bitkinin üzərində 4-5 yarpaq var. Onlardan 3 yarpaq zədələnmişdir. O zaman bu düstura əsasən zədələnmə balı 3-ə bərabər olur.

**P=(3x60)x100%\5x100=36%**

Belə nəticə çıxır ki, bu növlə zədələnən yarpaqların zədələnmə intensivliyi 36%-ə bərabərdir. Müşahidələrimizdən gorürük ki, stasionar sahələrdə bu növün vurduğu zərər lokal xarakter daşıyır. Ona görə də təbii entomofaqlarını cəlb etmək yolu ilə zərərvermə dərəcəsini tənzimləmək mümkündür.

Mənənələr tərəfindən çuğundurun yeraltı hissələrinin zədələnməsi və zərərvericilərin sahələrdə yayılması İ.Y.Polyakovun metoduna əsasən müəyyən edilmişdir.

## Nəticə

Şəkər çuğunduru ərazilərində yayılmış bu zərərverici növlərin məhv edilməsində kimyəvi və bioloji mübarizə metodlarından istifadə etmək vacibdir. Buna görə də fermerlərin bu məlumatlardan istifadə etmələri məqsədəuyğundur.

## Ədəbiyyat

1. Berim, M.N. (2009). Aphis fabae Scopoli. Black bean aphid interactive agricultural ecological atlas of Russia and neighboring countries. AgroAtlas.
2. Podyonov, K.P. i dr. (1980). Pests, diseases and weeds of sugar beet and measures to combat them. M.: Vintage, p.79.
3. Petrukha, E.I. Main pests of sugar beets. M.: Rosselkhozizdat, 196 p., p.372-402.
4. Pavlyuk, N.I. (1975). Root beet aphid (Pemphigus fuscicornis Koch) and biological justification for measures to combat it in conditions of Poltava region: Author's review., dis. cand. biol. science. Kharkiv, x. in-t., p.23.
5. Mamontova, V.A., Kosmachevski, A.S. (1976). Kornevaya sveklovichnaya aphid. M.: Colossus, 64 s.
6. Zemtsov, S.M. (2017). Cane rot. Many questions and few answers. Journal "Sugar", HT Prom, No.4, p.2-5.
7. Zverezomb-Zubovsky, E.V. (1956). Pests of sugar beets. Kiev: Izd. AN.Ukr. USSR, 276 p.
8. Doroshina, L.P. (1981). Life cycles of beet root aphids and species close to it. Kiev: Naukova Dumka, p.124.
9. Qazi, S.Q. (2016). Çuğundur kök mənənəsinin bioekoloji xüsusiyyətləri. Gəncə Beynəlxalq Elmi Konfransı. Gəncə, s.51-58.
10. http://anl.az/el/Kitab/2017/10/cd/2016-2346.pdf
11. Qazi, S.Q. (2015). Şəkər çuğunduruna zərər verən bəzi böcəklər (Coleoptera). Bakı, Zoologiya İnstitutunun Əsərləri, 33-cü cild, №1, s.78-86.
12. Gazi, S.G. (2020). Role of entomophages in sugar beet agrocenosis. XXIII International Scientific Conference "Modern Scientific challenges and trends", p.17-19.

**Rəyçi: biol.ü.f.d. Barat Əhmədov**

Göndərildi: 12.05.2022 Qəbul edildi: 29.07.2022

DOI: https://doi.org/10.36719/2707-1146/23/32-36

**Aytəkin Ramiz qızı Hüseynova**
Bitki Mühafizə və Texniki Bitkilər Elmi-Tədqiqat İnstitutu
doktorant
ahuseynova516@gmail.com

# MƏHSULDAR ŞƏKƏR ÇUĞUNDURU BECƏRİLMƏSİNİN ƏSASINDA SƏMƏRƏLİ TORPAQBECƏRMƏ DURUR

**Xülasə**

Məhsuldar şəkər çuğundurunu yetişdirmək üçün ilkin tədbirlərin yerinə yetirilməsində başlıca səbəblər nələrdən ibarətdir və hansı tədbirlər həyata keçirilməlidir? Torpağın düzgün becərilməsi üçün ən əsas onun su-fiziki xassələri və kimyəvi tərkibi öyrənilməlidir. Bunları bilməklə yanaşı, həmçinin şəkər çuğunduru bitkisi üçün vacib amillər də öyrənilməlidir. Bu bitki torpaqdan nələri mənimsəməlidir ki, məhsuldarlığı yüksək olsun. Məhsuldarlığı artırmaq birbaşa torpağın yüksək səviyyədə becərilməsindən asılıdır. Şəkər çuğunduru bitkisi üçün münbit torpağın hazırlanması birbaşa məqalədə qeyd olunan torpaq və iqlim amillərindən, torpağın becərilmə metodlarından və s. asılıdır.
***Açar sözlər:*** *şəkər çuğunduru, aqrotexnologiya, mübarizə, məhsuldarlıq, xəstəlik, zərərverici, alaq otları*

**Aytekin Ramiz Huseynova**

## Effective soil cultivation is the basis of productive sugar beet cultivation

**Abstract**

What are the main reasons for the implementation of the initial measures to grow productive sugar beet and what measures should be implemented. For the proper cultivation of the soil, it is necessary to study its water physical properties and its chemical composition. In addition to knowing these, important factors for the sugar beet plant should be studied. What does this plant absorb from the soil so that its productivity is high. Increasing the productivity directly depends on the high cultivation of the soil. The preparation of fertile soil for the sugar beet plant directly depends on the soil and climate factors mentioned in the article, soil cultivation methods, etc. it depends.
***Keywords:*** *sugar beet, agrotechnology, struggle, productivitiy, diseases, pests, weeds*

## Giriş

Azərbaycan Respublikası Prezidenti cənab İlham Əliyevin son illlərdə regionların sosial-iqtisadi inkişafının sürətləndirilməsinə xidmət edən cəsarətli qərarları və müntəzəm qayğısı kənd təsərrüfatında sahibkarlıq fəaliyyətinin stimullaşdırılmasına yeni təkan vermişdir.

Kənd təsərrüfatı məhsullarının yüksək səviyyədə istehsalı dünyəvi bir məsələdir. Bitki həyatının müxtəlif dövrlərinə uyğun müxtəlif tələbləri olur. Əgər bitkiyə vaxtında lazımi qulluq olunarsa, bu, bitkinin məhsuldarlığı ilə nəticələnər. Bundan əlavə, aqrotexniki tədbirlər sistemi vasitəsilə onların daha yaxşı təmin olunmasına imkan yaradar. Əgər məhsuldarlıq yüksək göstərici göstərirsə, bu, birbaşa həyat amilləri hesabına olur.

*Şəkər çuğundurunun xalq təsərrüfatı əhəmiyyəti*

Əsas qida məhsulu olan şəkər çuğunduru şəkər istehsalı üçün karbohidratlarla zəngin kök yaradır. Şəkər çuğundurunun kökündə orta hesabla 17-18% şəkər vardır, ancaq yüksək şəkərli sortlarda 20%-ə, bəzən də daha çox, 23-24%-ə qədər şəkər olur.

Şəkər yaxşı mənimsənilməsi və yaxşı dad keyfiyyətlərinə malik olan, insan orqanizmi üçün yaxşı enerji mənbəyidir. Şəkər çuğundurunun köklərində şəkərdən başqa külli miqdarda C, $B_1$, $B_2$ vitaminləri, müxtəlif duzlar və başqa madələr vardır.

Şəkər çuğundurunun köklərindən şəkər çəkəndən sonra əmələ gələn tullantılardan spirt, qliserin, pektin kleyi, maya və başqa maddələr alınır (Hacıyev, Hüseynov, 2009: 124-127).

Şəkər çuğundurunun böyük yemçilik əhəmiyyəti də vardır. Bir hektardan orta məhsuldarlıq zamanı 70, yüksək məhsuldarlıq zamanı isə 150 yem vahidi əmələ gətirir. Tarla tullantıları − yarpaq, saplaq və kökün uc və təpə kəsikləri kənd təsərrüfatı heyvanları üçün qiymətli yem hesab olunur. Şirəli yemlik bitkilər arasında şəkər çuğunduru birinci yerlərdən birini tutur. Şəkər çuğundurunun yüksək yemlik dəyəri donuzların kökəldilməsi və südlük duru tullantılarının bir yem kimi böyük əhəmiyyəti vardır (Cəfərov, 1961: 47-52).

Şəkər çuğunduru bitkisinin aqrotexniki əhəmiyyəti də çox böyükdür. O, növbəli əkin sisteminin məhsuldarlığını yüksəldir. Ona görə də şəkər çuğunduru bitkisi bir çox bitkilər üçün yaxşı sələf bitkisidir, çünki onu əkməzdən əvvəl tarlada dərin şum aparılır. Üzvi və mineral gübrələr verilir, vegetasiya ərzində isə bitkilərə çox yaxşı qulluq edilir, becərmə işləri aparılır, bunların hamısı torpağın münbitliyini artırır, sahənin alaqdan, zərərvericilərdən və xəstəliklərdən təmizlənməsinə səbəb olur (Babayev, Mövsümov, Həsənov, Eyvazov, 2005: 33-35).

Şəkər zavodunda şirənin təmizlənməsi prosesində tullantı palçıq qalır ki, bundan gübrə kimi istifadə edilir. Şəkər çuğundurunun tarla tullantıları kənd təsərrüfatı heyvanlarından ötrü qiymətli yemdir. Çuğundurun ümumi çəkisinin $^1/_3$-$^1/_2$ hissəsini yarpaqlar təşkil edir. Kimyəvi tərkibinə görə çuğundur yarpaqlarında (başsız) 12-20%-ə qədər quru maddələr, o cümlədən 2-3% zülal, təqribən 0,4% yağ vardır. Onlardan yaşıl yem kimi silos basdırılmış və qurudulmuş ot şəklində istifadə edilir. Şəkər çuğunduru bitkisinin yarpaqları vitaminlərlə çox zəngindir (Məmmədova, 2007: 31-33).

Kənd təsərrüfatı bitkilərinin normal böyüyərək inkişaf etməsi, məhsuldarlığının yüksək olması üçün əsas şərtlər, yəni həyat amillərinə olan tələbat tam şəkildə ödənilməlidir. Bitkilərin inkişafında tələb olunan amillərin bəziləri əsasən torpaqdan ödənilir. Torpağın yaxşı becərilməsi bitkinin havalanmasına, rütubətliyin qorunmasının, qida maddələrinin bitki tərəfindən yaxşı mənimsənilməsinə, əkin qatının yaxşılaşdırılmasına müsbət təsir göstərir. Ona görə də istənilən kənd təsərrüfatı bitkilərinin yüksək məsuldarlığına nail olmaq üçün birbaşa düzgün becərmədən başlamaq lazımdır (Məmmədov, 2007: 172-179).

Torpaqbecərmə qədim zamanlardan indiyə qədər həmişə diqqət mərkəzində olmuşdur. İnsanlar daima əlverişli, məqsədəuyğun yollar axtarmışlar. Aqrotexnikadan istifadə qaydalarını bitkiyə və torpağa hansı mənfi və müsbət təsirlərin göstərməsini öyrənməyə başlamışlar.

Becərmə olduqca mürəkkəb bir prosesdir. Hazırda torpağın əsas becərilməsi üsulları kotanın laydırının formasının dəyişdirilməsi və kotanla becərməni tamamlayan digər alətlərdən istifadə olunması hesabına aparılır. Müasir əkinçilikdə konkret təbii-iqtisadi şəraitə uyğun olaraq torpağın əsas, səpinqabağı və səpindən sonra becərilməsinin xüsusiyyətlərini əhatə edən çoxsaylı tədqiqat materialları əldə edilmişdir. Buraya torpağın müxtəlif qaydada becərilməsinin üsulları, müddəti və dərinliyinin öyrənilməsi eroziyaya qarşı mübarizə tədbirlərinin müəyyən edilməsi, xüsusi iki-üç laylı torpaq becərən alətlərin hərəkət surətinin öyrənilməsi torpağın becərilməsi istiqamətindən asılı olaraq həm əkin qatında, həm də istənilən qatda aparıla bilər. Becərmə iqlim şəraitindən, torpağın tipindən, əkiləcək bitkilərin bioloji və ekoloji xüsusiyyətlərindən və s. bir çox amillərdən asılı olaraq müxtəlif formalarda aparıla bilər. Becərmənin səmərəliliyi də elə bu zaman aydın görsənir (Babayev, Babayev, 2011: 72-76).

Torpağın becərilməsinin səmərəsi onun düzgün seçilməsi və vaxtında aparılması yolu ilə artırıla bilər. Torpağın becərilməsinin qarşısında aşağıdakı məsələlər durur:

1. Bitkilər üçün əlverişli su, hava, istilik və qida rejimləri yaratmaq məqsədilə əkin qatının quruluşunu və struktur vəziyyətini dəyişdirmək;
2. Torpağın nisbətən dərin qatlarında olan qida maddələrindən ardıcıl istifadə etmək, torpağa verilən gübrələrin müxtəlif dərinliyə basdırılması nəticəsində qida rejimini yaxşılaşdırmaq və faydalı mikroorqanizmlərin həyat fəaliyyətini gücləndirməklə mikrobioloji proseslərə lazımi istiqamət vermək;
3. Kənd təsərrüfatı bitkilərinin zərərvericilərinin, xəstəliktörədicilərinin və alaq bitkilərinin məhv edilməsi;
4. Bitki qalıqlarını və gübrəni vermək;
5. Torpağı su, külək eroziyasından qorumaq;
6. Xam və dincə qoyulmuş torpaqları becərərkən çoxillik otları məhv etmək;
7. Mədəni bitki toxumlarının optimal dərinliyə basdırılmasına şərait yaratmaq;
8. Şırımaçma, tirə, ləklər düzəltmə və s. yollar ilə əlverişli mikrorelyef yaratmaq.

Bəzi hallarda torpaq becərmənin qarşısında duran bir məsələnin həlli digəri ilə ziddiyyət təşkil edir. Məsələn, torpağın intensiv becərilməsi, onun struktur vəziyyətini yaxşılaşdırmaqla bərabər humusun

parçalanmasını sürətləndirir və münbitlikdən səmərəli istifadə edilməsinə təsir edir. Və yaxud, torpağın üst qatında bitki qalıqlarının saxlanılması eroziya prosesinin qarşısını aldığı halda, alaq otlarının, xəstəlik və zərərvericilərin yayılmasına şərait yaradır. Torpağın mexaniki becərilməsində istifadə olunan maşın və alətlərin çoxsaylı gedişi nəticəsində torpaq daha çox kipləşir və onun su-fiziki xassələri pisləşir. Ona görə də əməliyyatları birləşdirməklə torpaqbecərmənin sayının minimuma endirilməsinə üstünlük verilməlidir (Bazdirev, Loshakov, Puponin, 2000: 135-141).

*Cərgəarası becərmələr*

Cərgəarası becərmələrin əsas məqsədi səpindən sonra bərkimiş torpağı yumşaldıb yararlı hala salmaqdır. Cərgəarası becərmədə kipləşmiş torpaq xırdalanaraq bitkinin yaxşı inkişaf etməsinə, torpaqda nəmliyin saxlanmasına, torpaqda gedən kimyəvi və bioloji proseslərin gedişinə, torpağın və bitkinin hesablanması və məhsuldarlığın nəzərə çarpacaq dərəcədə artmasına müsbət təsir edir, torpağın bioloji potensialını artırır, sahəni alaqlardan təmizləyir və verilən qida maddələrindən (NPK) bitkilər səmərəli istifadə edir.

Cərgəarası becərmə torpağın su sızdırma qabiliyyətini artırmaqla dərin şırımların açılmasına zəmin yaradır. Bu şırımlar suvarma suyundan səmərəli istifadə olunmasını və suvarmaların düzgün aparılmasını təmin edir, nəticədə torpağın üst qatı yumşalır. Bu da gübrələrin istənilən dərinliyə verilməsinə və səmərəli istifadə olunmasına şərait yaradır (Cəfərov, 2007: 201-214).

Nə qədər ki, cərgəarası becərmələrdə əsas məsələ alaqlara qarşı mübarizədən gedir, o zaman müəyyən edilməlidir ki, hansı dərinlikdə becərməni apardıqda sahə alaq otlarından tam təmizlənə bilər. Ancaq dərin və dayaz becərməni apardıqda sahə alaq otlarından tam təmizlənə bilər. Sahəni ancaq dərin və dayaz becərdikdə kəskin alaqlanma dərəcəsinə görə fərqi təyin etmək olar. Dərinliklər arasındakı fərq az olsa, məsələn, 10-12 sm-lə 15-18 sm arasında, o zaman alaqlanma dərəcəsinə görə fərq əhəmiyyətsiz görünür (Gerasimenko, 2005: 59-62 ).

Şəkər çuğunduru bitkisi Azərbaycan Kənd Təsərrüfatının qabaqcıl, diqqət mərkəzində olan və geniş becərilən bitkilərindən biridir. Onun düzgün texnologiya ilə becərilməsi yüksək və keyfiyyətli məhsul əldə etməyə şərait yaradır. Şəkər çuğundurunun düzgün emal edilməsi həm fermerlər, həm də insanlar üçün vacibdir. Məlum olduğu kimi, şəkər çuğunduru güclü kök sisteminin inkişafı, aktiv mikrobioloji proseslər gedən ehtiyat nəmliyin və qida maddələrinin toplanması üçün əlverişli olan qalın şum qatına malik qida maddələrinin toplanması üçün əlverişli olan zəngin torpaqları sevən bitkidir. Burada torpağın strukturunun, qrunt sularının səviyyəsinin müəyyənləşdirilməsinin də əhəmiyyəti böyükdür. Becərmə texnologiyasında əsas şərtlərdən biri sağlam və bərabər çıxışın alınması məqsədi ilə payız və yaz aylarında torpağın keyfiyyətli hazırlanmasıdır (Ivashenko, 2006: 23-28).

Səpinlə birlikdə və ya bundan sonra dərhal torpaq vərdənələnməlidir. Bu aqrotexniki tədbir torpağın üst qatını hamarlamaqla kipləşdirir və bunun hesabına nəmliyin toxuma keçməsi üçün əlverişli şərait yaranmış olur.

*Çuğundur əkinlərinə qulluq texnologiyası*

Əkinlərə qulluq üzrə texnoloji əməliyyatların məqsədi bunlardır: şəkər çuğundurunun mütəşəkkil cücərtilərinin əmələ gəlməsi, bunların bütün vegetasiya ərzində yaxşı boy verib inkişaf etməsi üçün əlverişli şərait yaratmaq, hər hektarda lazımi miqdarda bitki sıxlığının formalaşdırılması, alaqların tam məhv edilməsi, bitkinin xəstəlik və ziyanvericilərdən mühafizəsi. Bütün bu tələbatları yerinə yetirmək üçün aqrotexniki sistemə aşağıdakılar daxil edilmişdir: cücərtilər alınana kimi torpağın kipləşdirilməsi (vərdənələrlə), başdan-başa yumşaldılması, cücərtilərin mexaniki seyrəldilməsi (yeri gəldikdə buketlərin əllə düzəldilməsi), cərgələrarası zolaqda və cərgənin özündə torpağın yumşaldılması, insektisid və funqisidlərin alaq olduqda isə herbisidlərin tətbiqi. Hər bir əməliyyatın vaxtında və keyfiyyətli yerinə yetirilməsi mütləqdir. Bu zaman hər bir tarlanın konkret şəraitinə müvafiq aqrotexnika tətbiq edilir. Çuğundurun becərilməsi üzrə olan tədbirlərin ümumi istehsal texnologiyasının digər elementləri ilə dəqiq əlaqələndirilməsi istehsalda əl əməyini tam aradan qaldırmağa və ya minimuma endirməyə tam şərait yaradır, yüksək məhsul əldə edilməsinə xeyli kömək etmiş olur. Yüngül qranulometrik torpaqlarda çuğundur toxumları səpildikdən sonra sahə СКГ2-1, СКГ-2 markalı susəpənli və ya həlqəvi-dişli vərdənələrlə (ККН-2,8) vərdənələnir. Cücərtilər torpaq səthinə çıxmamışdan əvvəl alaq otlarını ilk inkişaf fazasında məhv etmək, torpaq qaysağına qarşı etibarlı aqrotexniki tədbirdir. Bu məcburi tədbir nəinki alaq otlarını 70-80%-ə qədər məhv edir, eyni zamanda torpaqda bioloji prosesi fəallaşdırır, beləliklə də, toxumun tarla cücərmə faizini nəzərə çarpacaq dərəcədə artırır. Cücərtilər əmələ gələnə kimi sahədə

ЗБЗСС-1,0, ЗБП-0,6А, ЗОР-0,7 markalı yumşaldıcılarla həyata keçirilən torpaq yumşaldılması kökyeyən ziyanverici ilə mübarizədə ən etibarlı aqrotexniki tədbir görmək lazımdır (Əliyev, 1974: 24-28).

*Torpağa tələbat*

Şəkər çuğunduru bir-birindən çox fərqli torpaq-iqlim şəratində becərilə bilir. Çuğundur, əsasən adi, qüvvətli qələvi, zəif qələvi, podzollaşmış qara torpaqlar və digər müxtəlif torpaqlarda becərilir. Çuğunduru boz-meşə, çimli-podzollaşmış, çəmən-boz, şabalıdı və boz torpaqlarda da becərmək olar. Humus təbəqəsinin qalınlığı-sıxlığı, kimyəvi tərkibi və su-fiziki xüsusiyyətlərinə görə yuxarıda adı çəkilən torpaq tipləri də bir-birindən kəskin surətdə seçilməklə çuğundurun bioloji xüsusiyyətlərinə eyni qaydada müvafiq deyildir (Hümbətov, Şabanov, Verdiyeva, 2013: 56-57).

Qalın humus təbəqəsinə malik (humusu üst təbəqədə olan) qara torpaqlar şəkər çuğunduru yetişdirmək üçün ən əlverişli torpaqlar sayılır. Bu torpaqlar eyni zamanda neytral reaksiyalı və ya zəif turş reaksiyası və yaxşı su-fiziki xüsusiyyətlərə malik olmalıdır. Torpaq yumşaq quruluş və strukturda olduqda onda şəkər çuğunduru üçün ən əlverişli (1:1) hava və su nisbəti təmin edilmiş olur.

Vegetasiya müddətində şəkər çuğundurunun suya tələbatı, şəkər çuğundurunun boy proseslərinin yavaşıması və kökümeyvə məhsulunun azalması əsas mineral elementlərin − azotun, fosforun, kaliumun və başqa qida maddələrinin çatışmazlığı şəraitində baş verir.

*Azot*

Şəkər çuğundurunun istifadə etdiyi külli miqdar mineral qida elementləri içərisində azotun xüsusi rolu vardır. Belə ki, bu maddə bitki orqanizmin normal həyatı üçün mütləq olan bütün amin turşuların, fosfamidlərin tərkib hissəsi − komponenti sayılır. Hər hektardan 30 ton şəkər çuğunduru alındıqda, bu bitki 120-160 kq azot, yəni, dənli taxıl bitkilərində olduğundan (3 t/ha məhsuldarlıqla) 1,9-2 dəfə çox azot tələb edir. Məşhur aqrokimya alimləri müəyyən etmişlər ki, şəkər çuğundurunun azot qidasının əsasını azot birləşmələrinin ammiak və nitrat formaları təşkil edir. Şəkər çuğunduru bütün vegetasiya boyu azota tələbat göstərməsinə baxmayaraq, vegetasiyanın birinci yarısında, yəni assimilyasiya səthinin intensiv artan vaxtı azotun çatışmaması bitkinin boyatma və inkişafını ciddi surətdə pozur. Azotun çatışmaması ilk növbədə bitkinin boyverməsini zəiflədir. Bununla yanaşı, toxum cücərən dövrdə torpaqda azotun həddən artıq olması, cücərtilərin sıxıntı çəkməsinə səbəb olur. Xüsusən, bitkinin şəkər toplama fazasında azotun çox olmasına heç vaxt yol vermək olmaz. Bu dövrdə güclü azot qidalanması yeni yarpaqların intensiv surətdə əmələ gəlməsinə səbəb olur ki, bunun sayəsində də əvvəlki fazalarda toplanmış plastik maddələr, hətta belə şəkər həmin təzə yarpaqlara sərf edilir. Bu hal isə öz növbəsində kökümeyvədə şəkər faizinin azalmasına təsir göstərir. Ancaq bilmək lazımdır ki, podzollaşmış torpaqlarda şəkər çuğunduru əkinlərində azotun kaliumla əlaqəli verilməsi kökümeyvə məhsulunu kəskin surətdə artırmaqla yanaşı, burada şəkər faizini də artırır. Əksinə, qaratorpaqlarda azotun yüksək normalarının tətbiqi şəkər çuğundurunda şəkər faizinin aşağı düşməsinə səbəb olur.

*Fosfor*

Şəkər çuğunduru azot və kaliuma nisbətən fosfora az tələbkardır, lakin bu elementin yüksək məhsulun formalaşmasında rolu böyükdür. Fosfor yarpaqların boyverməsini yaxşılaşdırır və köklərin torpağın daha dərin qatlarına kimi getməsinə əlverişli şərait yaradır. Şəkər çuğunduru fosforla tələb edilən qədər təmin edildikdə, o, quraqlığa davamlı olur və bununla yanaşı, istər vegetasiya dövründə, istərsə də məhsulun saxlanılması müddətində göbələk xəstəliklərinə qarşı davamlı olur, həmçinin kökümeyvədə şəkərin toplanmasında da fosforun rolu böyükdür. Bütün vegetasiya ərzində fosforun istifadəsi nisbətən eyni miqdarda olur. Fosfor aclığında yarpaqların və kökümeyvənin boyvermə tempi zəifləyir və eyni zamanda yarpaqların vaxtından qabaq qocalıb məhv olması baş verir. Həmin hal eyni ilə torpaqda həddən artıq fosfor olduqda da müşahidə edilir.

*Kalium*

Bu element də şəkər çuğunduru üçün azot və fosfor kimi vacibdir. Protoplazmanın yaşama fəaliyyəti, karbohidratların əmələ gəlməsi, bunların hərəkətinin intensivliyi və digər proseslər kaliumun olması ilə sıx surətdə bağlıdır. Torpaqda kalium çatışmadıqda kökümeyvə və şəkər məhsulu azalır. Şəkər çuğunduru yaşama fəaliyyətinin birinci ili kaliumu azotdan 1,5-2 dəfə, fosfordan isə 4-5 dəfə çox sərf edir. Çuğundurun torpaqda kaliumdan istifadəsi cücərmə fazasından məhsul yığımına kimi davam edir. Ancaq bu elementə nisbətən çox tələbat bitkinin cavan vaxtında, yəni üçüncü-dördüncü cüt yarpaqlar fazasında baş verir. Kaliuma tələbat ölçülərdə yarpaq və kökümeyvənin intensiv artması ilə əlaqədardır. Bundan başqa, kalium bitkinin soyuğa davamlılığını artırır. Kaliumla tələb olunan qədər gübrələmə bitkinin xəstəliklərə davamlılığını artırır, yığılmış məhsulun keyfiyyətini xeyli yaxşılaşdırır. Əksinə, torpaqda

kalium çatışmadıqda, yarpaq və kökümeyvənin boyverməsi zəifləyir, yarpaqlar soluxur, plastik qida maddələrinin axımı pozulur, bakteriya və göbələk xəstəliklərinə dözümlülük azalır.

*Kükürd*

Bitki hüceyrələrinin tərkib hissəsinə daxil olur. Əgər torpaqda kükürd çatmazsa, çuğundur yarpaqlarının səthini qonur ləkələr bürüyür, yarpaq əvvəlcə saralır, sonra isə quruyur.

*Maqnezium*

Xlorofil dənəciklərinin tərkibinə daxil olub, bitki tərəfindən fosfor turşusunun mənimsənilməsinə kömək edir.

*Manqan*

Çuğundur yarpaqlarında şəkərin toplanaraq köklərə doğru hərəkət etməsinə təsir edir. Bununla bərabər, bitkinin böyüməsini sürətləndirir və xloroz xəstəliyinin qarşısını alır.

*Bor*

Bitkidə katalizator kimi iştirak edir və çuğundur kökündə şəkərin toplanmasına təsir edir. Çuğundur yarpaqlarında bor çatmadıqda bitki saralır, boy nöqtəsi tələf olur və bitki kökünün özəyində çürümə xəstəliyi baş verir (Hümbətov, 2019: 20-21).

## Nəticə

Məqalənin mahiyyətindən belə nəticəyə gəlmək olar ki, təkcə şəkər çuğunduru üçün deyil, eyni zamanda bütün bitkilər üçün məhsuldarlığın yüksəldilməsi səmərəli torpaqbecərmədən başlayır. Bu, məhsuldarlığı artırmağın ən optimal və məqsədəuyğun mərhələsidir. Əsaslı təcrübə göstərir ki, məhsuldarlıq iqlim və torpaq amillərinin, torpaqbecərmənin düzgün tətbiqindən birbaşa asılıdır. Şəkər çuğunduru bitkisinin standartlara uyğun, yəni keyfiyyətli məhsul verməsi üçün səmərəli torpaq anlayışı vacibdir. Bu anlayışın içərisində bir çox asan və çətin proseslər durur. Bitkilərin mədəniləşdirilməsinin kökündə də, məhz məqalədə qeyd olunan məsələlər dayanır. Torpaqbecərmə o zaman əhəmiyyət kəsb edir ki, ondan istifadə edərkən insanlar xeyir görsün. Bu, uzun illər alimləri düşündürmüş və onların bir çoxu torpaqbecərmənin son dərəcə əhəmiyyətini öz əsərlərində qeyd etmişlər. Torpaqbecərmənin vacibliyi haqqında uzun illər bir-birindən fərqli, mürəkkəb müzakirələr getmişdir.

## Ədəbiyyat

1. Hacıyev, C., Hüseynov, M. (2009). Əkinçilik. Bakı: Araz nəşriyyatı, 310 s., s.124-127.
2. Cəfərov, T. (1961). Şirəli meyvələr. Bakı: Azərnəşr, 103 s., s.47-52.
3. Babayev, M.P., Mövsümov, Z.R., Həsənov, V.H., Eyvazov, İ.E. (2005). Şəkər çuğundurunun becərilmə texnologiyasının torpaq ekoloji və qidalanma şəraiti. Bakı: Elm, 79 s., s.33-35.
4. Məmmədova, A.S. (2007). Şəkər çuğunduru bitkisinin xəstəlikləri haqqında Azərbaycan Kənd Təsərrüfatı Akademiyasının Elmi əsərləri. Gəncə, III buraxılış, 244 s., s.31-33.
5. Məmmədov, Q.Ş. (2007). Azərbaycanın torpaq ehtiyatlarından səmərəli istifadənin sosial-iqtisadi və ekoloji əsasları. Bakı: Elm, 352 s., s.172-179.
6. Babayev, A.H., Babayev, V.A. (2011). Ekoloji kənd təsərrüfatının əsasları: Dərslik. Bakı: Qanun nəşriyyatı, 383 s., s.72-76.
7. Bazdirev, G.P., Loshakov, B.T., Puponin, A.I., i dr. (2000). Zemledelie. Kolos, 304 s., s.135-141.
8. Cəfərov, İ. (2007). Ümumi fitopatologiya. Bakı: Elm, 392 s., s.201-214.
9. Gerasimenko, E. (2005). Zdorobiylist-bolshoy urojay, vzveshenniy podkhod k gribnimi boleznyami listev sakharnoy svekly. Gl. agronom. No.7, s.225, s.59-62.
10. Ivashenko, A. (2006). Perspektivnaya kultura. Zerno, No.7, 299 s., s.23-28.
11. Əliyev, S.C. (1974). Azərbaycanın suvarma şəraitində şəkər çuğunduru toxumçuluğunun bioloji və aqrotexniki əsasları. Kirovobad, 43 s., s.24-28.
12. Hümbətov, H.S., Şabanov, M.C., Verdiyeva, R.C. (2013). Şirəli yem bitkiləri. Bakı: Nurlan, 152 s., s.56-57.
13. Hümbətov, H.S. (2019). Şəkər çuğunduru. Gəncə, 104 s., s.20-21.

**Rəyçi: aqr.e.ü.e.d. Ələddin Tağıyev**

Göndərildi: 16.04.2022 Qəbul edildi: 22.07.2022

# İÇİNDƏKİLƏR

## BİOLOGİYA ELMLƏRİ VƏ AQRAR ELMLƏR
## BIOLOGICAL AND AGRARIAN SCIENCES



İmzalandı: 17.08.2022
Kağız formatı: 60/84
H/n həcmi: 4,75 ç.v.
Sifariş: 554

"ZƏNGƏZURDA" çap evində çap olunub
**Ünvanı:** Bakı şəh., Mətbuat prospekti, 529-cu məh.
Tel.: +994 50 209 59 68
+994 55 209 59 68
+994 12 510 63 99
e-mail: zengezurda1868@mail.ru